## UCA ALLAHA İMAN GƏTİRMƏK

Bu Onun varlığına (mövcudluğuna), rübubiyyətinə (tanrılığına), üluhiyyətinə (ilahiliyinə), adlarına və sifətlərinə inanmaq deməkdir. Bunlardan birinə inanmaqda nöqsana yol verən adamın inamı batildir (yalandır).

**Rububiyət** – Allahı xəlq etmək (yaratmaq), tədbir tökmək (işləri idarə etmək, qaydasına qoymaq) və mülk (səltənət, sahiblik, ixtiyar) məsələlərində fərdləşdirmək, yəni bu məfhumların hamısını yalnız Ona aid etmək deməkdir.

Uca Allah Özü haqqında belə buyurmuşdur:

**«Yaratmaq da, əmr etmək də Onun işi deyilmi?»** (əl-Əraf, 54)

Burada *«əmr etmək»* ifadəsi «tədbir tökmək» mənası verir.

Başqa bir ayədə isə Uca Allah belə buyurur: **«Göylərin və yerin ixtiyarı Allahındır»** (əl-Casiyə, 27)

**Uluhiyyət** – Allahı ibadətdə fərdləşdirmək, yəni yalnız Onu ilahi saymaq, ilahiləşdirməkdir. İbadət isə özünə əmr Edənə rəğbət göstərmək və Ona çatmaq istəyinə əsaslanan işləri yerinə yetirməkdən, təzim etməyə və bu təzim olunan əzəmətli varlıq qarşısında dəhşət hissi keçirməyə əsaslanan qadağanları gözləməkdən ibarət olan əməllər kompleksidir.

Uca Allah buyurmuşdur: **«Biz hər bir ümmətə bir elçi göndərib əmr etdik ki, Allaha ibadət edin və tağutdan** (şeytandan) **uzaqlaşın!»** (ən-Nəhl, 36)

**Adlar və sifətlər**. Bu, Allahın Quranda Özünü vəsf etdiyi və Onun elçisi Məhəmmədin (s.a.v.) Onu vəsf edərkən işlətdiyi ad və əlamət bildirən sözlərin ifadə etdikləri mənaların doğru olduğuna və bunların yalnız Qüdrətli və Böyük Allaha xas olduğuna inanmaqdır. Bu zaman heç bir təşbihə (bənzətməyə), təhrifə (əyintiyə), təvilə (sözü öz həqiqi mənasından uzaqlaşdırıb ona başqa yozum verməyə) və tətilə (bu ad və sifətlərdən hər hansını inkar etməyə) yol vermək olmaz. Bu sözlərlə ifadə olunmuş mənaların necəliyi (keyfiyyəti) haqqında soruşmaq da olmaz.

Uca Allah Özü haqqında buyurmuşdur: **«Ona bənzər heç bir şey yoxdur, O hər şeyi Eşidən və Görəndir»** (əş-Şura, 11)

Allahın Özünü vəsf etdiyi sifətlərin Ona xas olduğunu inkar etmək, sözləri öz yerində işlətməmək, Onun adlarını deyərkən və möcüzələri haqqında danışarkən əyintiyə yol vermək olmaz. Onun sifətlərinin necəliyi haqqında suallar vermək, onları Onun yaratdıqlarının sifətlərinə bənzətmək də olmaz. Çünki bütün nöqsanlardan azad Allahın heç bir adaşı, heç bir bərabəri, oxşarı yoxdur və O Öz yaratdıqları ilə müqayisə edilə bilməz. Pak və müqəddəs Allah Özünü və başqalarını hamıdan yaxşı tanıyır. O, Öz xəlq etdiklərinin hamısından doğru və gözəl danışır. Onun Özündən sonra Onun elçiləri doğru danışmaqları ilə tanınmışlar. Buna görə də Allah demişdir: **«Sənin bütün nöqsanlardan azad yenilməz qüdrət Sahibi Tanrın onların təsvir etdikləri sifətlərdən tamamilə uzaqdır. Peyğəmbərlərə**

**salam olsun! Aləmlərin Tanrısı Allaha həmd olsun!»** (əs-Saffat, 180-182).

Buradan göründüyü kimi, Allah Özünün Onun elçilərinə müxalif olan adamların etdikləri təsvirlərdəki nöqsanlardan azad olduğunu deyir və peyğəmbərləri bu müxaliflərin dedikləri nöqsanlardan və eyiblərdən salamat olduqları üçün onları salamlayır. Nüeym bin Həmmad (Allah ona rəhmət eləsin!) demişdir: «Kim Allahı Allahın yaratdıqlarına bənzətsə, kafirlik etmiş olur. Kim Allahın Özünü vəsf etdiklərinə hörmətsiz yanaşsa, o da kafirlik etmiş olur. Allahın Öz-Özünü və Öz elçilərini vəsf etdiyi sifətləri başqa varlıqların sifətlərinə bənzətmək olmaz. Kim Uca Allahın aydın ayələrdə və səhih hədislərdə (doğru xəbərlərdə) Allahın böyüklüyünə layiq şəkildə göstərilmiş sifətlərini təsdiq etsə və Uca Allahda nöqsanların ola biləcəyini inkar etsə, o, doğru yol olan hidayət yolunun yolçusu olur»[1].

### ŞİRKİ RƏDD ETMƏK

**Şirk Allaha ortaq qoşmaqdır.**

Uca Allah buyurur: **«Əgər onlar** (Allaha) **şərik qoşsaydılar, etdikləri əməllər puça çıxardı»** (əl-Ənam, 88)

Uca Allah başqa bir ayədə buyurur: **«Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətə heç kəsi şərik qoşmasın»** (əl-Kəhf, 110)

Əbu Hüreyrənin[2] (Allah ondan razı olsun! – bundan sonra: r.) belə dediyi rəvayət olunur: «Allahın elçisi (s.a.v.) dedi: *«Uca Allah dedi: "Mən şərikə ən ehtiyacı olmayan şərikəm. Kim bir iş görərkən o işdə Mənə bir başqasını şərik etsə, onu özünün Mənə şərik qoşduğu ilə birlikdə qoyub tərk edərəm»*[3].

Deməli, Allah yalnız yararlı və xalis əməli qəbul edir. Əməlin yararlılığı dedikdə, onun Allahın elçisinə (s.a.v.) tabe olmaqdan, onun ardınca getməkdən ibarət olması, xalis (ixlasla) olması dedikdə isə onun Allaha ortaq qoşmaqdan azad olması nəzərdə tutulur.

### NÖQSANSIZ VƏ UCA ALLAHIN ƏZƏMƏTİNİ BİLMƏK

Uca Allah buyurmuşdur: **«...Onun izni olmadan yerə düşməməsi üçün göyü tutub saxladığını görmürsənmi? Həqiqətən, Allah insanlara şəfqətli və mərhəmətlidir»** (əl-Həcc, 65).

---

[1] Sitat böyük alim İbn Kəsirin Yunus surəsinin 3-cü ayəsinin təfsirindən gətirilmişdir.

[2] Əbdürrəhman bin Səxr əd-Dövsi. Öz paltarının qolunun içində pişik gəzdirdiyi üçün Əbu Hüreyrə (pişik atası – pişikbaz) ləqəbi almışdır. Səhabələrin ən çox hədis bilənlərindən olmuşdur. Çünki Peyğəmbər (s.) onun yaddaşı üçün dua etmiş, ona görə də o, eşitdiyini unutmamışdır. O, süffədə (Peyğəmbər məscidinin həyətində yoxsullar üçün tikilmiş talvarda) yaşayan yoxsullardan idi, hicri tarixi ilə 57-ci ildə vəfat etmişdir.

[3] İmam Müslimin öz «Səhih»inin «Zahidlik kitabı» fəslində (4/2289, 2985) rəvayət etdiyi hədis.

Əbu Zərin[4] (r.a.) belə dediyi rəvayət olunur: «Allahın elçisi (s.a.v.) dedi: *«Səma inildədi. Onun inildəməsinə haqq verən o idi ki, onun hər dörd barmaqlıq yerində Uca Allaha səcdə edən bir mələk var. Allaha and olsun ki, siz mənim bildiyimi bilsəniz, az gülüb çox ağlayarsınız»*[5].

### ALLAHIN ÜLVİYYƏTİ İLƏ YAXINLIĞI, ƏZƏLİLİYİ İLƏ ƏBƏDİLİYİ ARASINDAKI ƏLAQƏNİ BİLMƏK

Uca Allah buyurmuşdur: **«Əvvəl də, axır da, zahir də, batin də Odur. O hər şeyi Biləndir»** (əl-Hədid, 3)

Əbu Hüreyrədən (r.a.) rəvayət olunur ki, Allahın elçisi (s.a.v.) yatandan qabaq Allaha dua edərək belə deyərmiş: *"İlahi! Sən əvvəlsən, Səndən qabaq heç nə olmamışdır; Sən axırsan, Səndən sonra heç nə yoxdur; Sən zahirsən, Səndən aşkar (üstdə) heç nə yoxdur; Sən batinsən (gizlisən), Sənsiz heç nə yoxdur! Bizim borcumuzu yox elə və bizi yoxsulluqdan qurtar!"*.[6]

### ALLAHIN ÖZ YARATDIQLARI ÜZƏRİNDƏKİ UCALIQDAN VƏ ÖZ ƏRŞİNİN ÜZƏRİNƏ UCALMASINDAN XƏBƏRDAR OLMAQ

Allah buyurmuşdur: **«...Onun Ərşi** (taxtı) **suyun üzərində idi...»** (Hud, 7).

Əbu Səid əl-Xüdridən[7] (r.a.) rəvayət olunur ki, Allahın elçisi (s.a.v.) belə demişdir: *«Siz mənə etibar etmirsinizmi? Axı mən səmada Olanın etibar etdiyi adamam. Mənə səhər-axşam səma xəbəri gəlir»*[8].

Allah Quranın yeddi yerində işlətdiyi **«Rəhman Ərşin üzərinə istiva etdi** (ucaldı)»[9] ayəsində isə bütün nöqsanlardan azad Allah Özünün Ərşin üzərində olduğunu xəbər vermişdir. Ərəb dilində «istiva etmək» feli ucalmaq, qalxmaq, çıxmaq, qərar tutmaq mənalarını verir. İmam Malik (Allah ona rəhmət eləsin!) demişdir: «İstiva (Allahın Öz Ərşi üzərinə ucalması) məlumdur (bilinir), Onun ora necə ucalması isə məchuldur (bilinmir). Ona (istivaya) inanmaq vacibdir, onun (necəliyi) haqqında sual vermək isə bidətdir (dinsizlikdir)». Abdullah bin əl-Mübarək demişdir: «Biz nöqsanlardan uzaq Tanrımızın Öz səmalarının

---

[4] Əbu Zər əl-Ğəffari: doğru danışan məşhur zahid olmuşdur. İslama ilk daxil olan beş nəfərin beşincisidir. Ucaboy, qarayanız, arıq bir adam imiş. Onun fəziləti Peyğəmbərin bu kəlamında təsvir olunmuşdur: «Nə səma Əbu Zərdən doğru danışan bir kəsin üstünə kölgə salıb, nə də yer beləsini öz üstündə daşıyıb» (ət-Tirmizinin rəvayət edib həsən (yaxşı) hədis hesab etdiyi hədisdir). Əbu Zər hicri 31-ci ildə ər-Rübzədə vəfat edib. Elmdə İbn Məsuda bərabər tutulurmuş.

[5] Ət-Tirmizinin (4/481, №2312) rəvayət edib həsən-qərib (yaxşı, az danışılan) adlandırdığı hədis. Onu İbn Macə, Əhməd, ət-Təhavi və əl-Hakim də rəvayət etmişlər. Sonuncu onun isnadının səhih olduğunu söyləmişdir.

[6] Müslim (4/2084, №6827); Əbu Davud (№5051); ət-Tirmizi (№3400).

[7] Səd bin Malik əl-Ənsari: ən dərin bilikli və ağac altında Peyğəmbərə sədaqət andı içən (beyət edən) cavan səhabələrdən biri olmuşdur. Hicri 74-cü ildə vəfat etmişdir.

[8] Əl-Buxari. Hədis İbn Həcərin əl-Buxarinin «Səhih»inə yazdığı «Fəth əl-Bari» şərhindən (8/84, №4351) götürülmüşdür.

[9] Əl-Əraf, 54; Yunus, 3; ər-Rəd, 2; Taha, 5; əl-Fürqan, 59; əs-Səcdə, 4; əl-Hədid, 4.

üzərindəki Ərşi üzərində, Öz yaratdıqlarından kənarda olduğunu bilirik».

**ALLAHIN YATMADIĞINI – HƏMİŞƏ OYAQ OLDUĞUNU BİLMƏK**

Əbu Musanın[10] (r.a.) belə dediyi rəvayət olunur: «Bir dəfə Allahın elçisi (s.a.v.) bizim aramızda ikən ayağa qalxıb beş hikmətli söz dedi. Həmin sözlər bunlardır: *«Uca Allah yatmır, Ona yatmaq heç zəruri də deyil; O, qisməti endirib-qaldırır; Gecə edilən əməl onun yanına gündüz edilən əməldən əvvəl, gündüz edilən əməl isə gecə edilən əməldən əvvəl qalxır; Onun hicabı (pərdəsi) işıqdandır; O Öz hicabını qaldırsa, Onun üzünün gözəlliyi Onun yaratdıqlarından Onun baxışının çatdığı hər bir şeyi yandırar»*[11].

Uca Allahın bu kəlamı da bu deyilənləri təsdiq edir: **«Allahdan başqa heç bir tanrı yoxdur. Əbədi və əzəli varlıq Odur. O nə mürgü, nə də yuxu bilər...»** (əl-Bəqərə, 255).

Burada verilən hədisdəki «qismət» sözü qədər və ruzi tərəzisi mənasını verir.

Uca Allahın Özünün buyurduğu kimi: **«Allah istədiyi bəndənin ruzisini bol edir,** (istədiyininkini də) **azaldır»** (ər-Rəd, 26).

Bu hədisdə həm də Allahın üz sifətinin, yəni Onun Özünün varlığını, Öz görünüşü olduğunun təsdiqi bir daha öz əksini tapmışdır.

Axı Allahın Öz kəlamında da deyilir: **«Yalnız sənin cəlal və kərəm sahibi Tanrının Özü qalacaq»** (ər-Rəhman, 27).

**BÜTÜN NÖQSANLARDAN AZAD ALLAHIN QÜDRƏT Və BÖYÜKLÜYÜNÜ TƏSDİQ ETMƏK**

Uca Allah buyurmuşdur:

**«**(Müşriklər) **Allahı lazımınca qiymətləndirmədilər. Halbuki, Qiyamət günü Yer bütünlükdə Onun ovcunun içində olacaq, göylər isə Onun sağ əli ilə büküləcəkdir. Allah** (müşriklərin) **Ona aid etdikləri sifətlərdən tamamilə uzaq və ucadır»** (əz-Zümər, 67).

Yenə də Əbu Hüreyrənin (r.a.) belə dediyi rəvayət olunur: «Mən Allahın elçisinin (s.a.v.) belə dediyini eşitmişəm: *«Allah Yeri ovcuna alıb Öz sağ əli ilə səmanı qatlayıb bükür, sonra deyir: "Hökmdar Mənəm! Yerin hökmdarları haradadır?"»*[12]

**ALLAHIN İKİ ƏLƏ MALİK OLDUĞUNU TƏSDİQ ETMƏK**

Uca Allah buyurmuşdur: **«Xeyr, Allahın əlləri açıqdır, istədiyi kimi lütf və ehsan edər»** (əl-Maidə, 64)

Uca Allah həmçinin buyurmuşdur: **«... Halbuki, göylərin və yerin xəzinələri**

---

[10] Əbu Musa Abdullah bin Qeys. Peyğəmbər onun Quran oxuyarkən səsinin gözəl avazını eşitmiş və onun fəzilətini belə ifadə etmişdir: «Ona Davud ailəsinin tütəklərindən biri verilmişdir». Peyğəmbərin və xəlifələrin əmirliklərinin valisi olmuş, onun əli ilə bir neçə şəhər fəth edilmişdir. Hicri 42-ci ildə vəfat etmişdir.

[11] Müslimin öz «Səhih»inin «İman kitabı» fəslində (1/161, №129) rəvayət etdiyi hədis.

[12] Əl-Buxari (13/367, №7382); Müslim (№2787).

**Allaha məxsusdur...»** (əl-Münafiqun, 7)

Əbu Musanın (r.a.) belə dediyi rəvayət olunur: «Allahın elçisi (s.a.v.) dedi: *«Allah Öz əlini gecə uzadır ki, gündüz pislik edən tövbə etsin, gündüz uzadır ki, gecə pislik edən Günəş öz yerindən çıxanadək tövbə etsin»*[13].

Əbu Hüreyrədən (r.a.) rəvayət olunan mərfu[14] hədisdə deyilir: *«Allahın sağ əli elə doludur ki, O, gecə-gündüz nə qədər xərcləsə (sərf etsə, versə, işlətsə) də (sərvəti) tükənməz. Görmürsünüzmü O, göyləri və yeri yaradandan sonra nə qədər (sərvət) xərcləmişdir? Buna baxmayaraq, Onun sağ əlindəkilər tükənməmişdir. Qismət isə Onun o biri əlindədir, O onu qaldırır və endirir»*[15].

ALLAHIN EŞİTMƏ VƏ GÖRMƏ SİFƏTLƏRİNİN OLDUĞUNU TƏSDİQ ETMƏK

Əbu Hüreyrənin (r.a.) rəvayət etdiyinə görə, bir dəfə Allahın elçisi (s.a.v.) bu ayəni oxudu: **«Allah sizə əmanətləri öz sahiblərinə qaytarmanızı və insanlar arasında hökm etdiyiniz zaman ədalətlə hökm etmənizi əmr edir. Həqiqətən, Allahın bununla sizə verdiyi öyüd necə də gözəldir. Əlbəttə, Allah (hər şeyi) Eşidən və Görəndir»** (ən-Nisa, 58)

O bu ayəni oxuyarkən iki baş barmağını qulağının, onlardan sonra gələn iki barmağını isə iki gözünün üstünə qoydu»[16].

UCA ALLAHIN ELMİNİN ƏHATƏLİLİYİNİ VƏ QEYBİ ONDAN BAŞQA HEÇ KƏSİN BİLMƏDİYİNİ TƏSDİQ ETMƏK

Uca Allah buyurmuşdur: **«Yer üzündə yaşayan elə bir canlı yoxdur ki, Allah onun ruzisini verməsin. Allah onların sığınacaqlarını da, əmanət qoyulacaq** (ölüb, dəfn ediləcək) **yerlərini də bilir.** (Bunların) **hamısı açıq-aşkar kitabdadır»** (Hud, 6).

Allah həmçinin buyurmuşdur: **«Həqiqətən, qiyamətin qopacağı vaxtı ancaq Allah bilir. Yağışı göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə əldə edəcəyini, heç kəs harada öləcəyini bilməz. Allah isə şübhəsiz ki,** (hər şeyi) **Biləndir və** (hər şeydən) **Xəbərdardır»** (Loğman, 34)

Allahın başqa bir kəlamında deyilir: **«Qeybin açarları Allahın yanındadır, onları ancaq Allah bilir. Allah suda və quruda nə varsa bilir. Yerə düşən elə bir yapaq yoxdur ki, Allah onu bilməsin. Yerin zülmətləri içində elə bir toxum, elə bir şey yoxdur ki, açıq-aydın kitabda olmasın»** (əl-Ənam, 59).

---

[13] Müslim (4/2113, №2759).

[14] «Mərfu hədis» o hədisə deyilir ki, xüsusi olaraq Peyğəmbərə (s.) aid edilib, onun sözlərindən, hərəkətlərindən, yaxud verdiyi qərarlardan birini əhatə edir və hədisi rəvayət edən şəxs onun isnadını Peyğəmbərin (s.) özündən eşitmiş səhabəyədək davam etdirə bilir.

[15] Müslim (2/690, №993).

[16] Əbu Davudun öz «Sünən»ində «Sünnə kitabı» fəslində (4/233, №4728) rəvayət etdiyi hədis. Peyğəmbərin (s.) *«...hər şeyi Eşidən və Görəndir»* ifadəsini oxuyarkən öz barmaqlarını qulaqlarının və gözlərinin üstünə qoymasının mənası Uca Allahın eşitmə və görmə sifətlərini Onun böyüklüyünə və əzəmətinə layiq bir şəkildə təsdiq etməkdir. Əlbəttə, Allah eşidir və görür, lakin onun eşidib-görməsi bizimki kimi deyil. Uca Allah Özü buyurmuşdur: *«Ona bənzər heç bir şey yoxdur. O, hər şeyi Eşidən və Görəndir»* (əş-Şura, 11).

Əbu Zərin (r.a.) belə dediyi rəvayət olunur: «Bir dəfə Allahın elçisi (s.a.v.) iki qoçu kəlləşən (vuruşan, döyüşən) görüb dedi: *«Əbu Zər, onların nə üstündə kəlləşdiyini bilirsənmi?»* Dedim: "Yox". Dedi: *«Lakin Allah bunu bilir və onların arasında hesabı kəsəcək»*[17].

Allahın elçisi (s.a.v.) bunu da demişdir: *«Qiyamət günü hərənin hüququ özünə qaytarılacaq. Hətta buynuzsuz qoçun qisası buynuzlu qoçda qalmayacaq»*[18].

Abdullah bin Ömərdən (r.a.) rəvayət olunur ki, Allahın elçisi demişdir: *«Qeybin Allahdan başqa heç kəsin bilmədiyi beş açarı var: Allahdan başqa heç kəs sabah nə olacağını bilməz; Allahdan başqa bətnlərdən nə düşəcəyini heç kəs bilməz; Allahdan başqa yağışın nə vaxt yağacağını heç kəs bilməz; Allahdan başqa heç kəs kimin hansı torpaqda öləcəyini bilməz; Uğur sahibi Uca Allahdan başqa heç kəs qiyamətin nə vaxt qopacağını bilməz»*[19]

**BÜTÜN NÖQSANLARDAN AZAD OLAN ALLAHIN OĞLU OLDUĞUNU İDDİA EDƏNLƏRƏ QARŞI SƏBİRLİ OLMASINI BİLMƏK**

Uca Allah buyurmuşdur: **«Əgər Allah insanları günahlarına, haqsızlıqlarına görə cəzalandırsaydı, yer üzündə heç bir canlını sağ qoymazdı, lakin Allah onlara müəyyən müddət möhlət verər»** (ən-Nəhl, 61; Fatir, 45)

Əbu Musa əl-Əşaridən (r.a.) rəvayət olunur ki, Allahın elçisi (s.a.v.) belə demişdir: *«Heç kəs Allahdan eşitdiyi (gördüyü) əziyyətə Allahın (insanlardan) gördüyü əziyyətə səbir etdiyi (dözdüyü) kimi səbir edə bilməz; Onlar Allahın bir oğlu olduğunu iddia edirlər, Allah yenə də onlara sağlamlıq və ruzi verir»*[20].

Odur ki, Uca Allahın adlarından biri də əs-Səburdur və bu ad Ona asi olanlara cəza verməyə tələsməyən mənasını verir.

**ALLAHIN FƏRƏHLƏNMƏ (SEVİNMƏ) SİFƏTİNƏ MALİK OLMASINI TƏSDİQ ETMƏK**

Uca Allahın kəlamında deyilir: **«De: "Ey Tanrım, bağışla və rəhm et! Sən rəhm edənlərin ən yaxşısısan!»** (əl-Müminun, 118)

Uca Allah başqa bir kəlamında buyurur: **«Allah ən yaxşı Qoruyucudur və O, rəhmlilərin ən rəhmlisidir»** (Yusüf, 64).

Ənəs bin Malikin (r.a.) belə dediyi rəvayət olunur: «Allahın elçisi (s.a.v.) dedi: *«Sizin biriniz Allah qarşısında tövbə edəndə Allah o qədər fərəhlənir (sevinir) ki, Onun fərəhi bir biyabanda dəvəsi əlindən çıxıb yüklə birlikdə yemək-içməyini də qaçırandan sonra ümidini itirib bir ağacın kölgəsində uzandığı halda, birdən dəvəsini öz yanında görüb onun ovsarından yapışan və bunun üçün Allaha dua edərkən sevindiyindən səhv edib: «İlahi! Sən mənim*

---

[17] İmam Əhmədin rəvayət etdiyi hədis (5/162, 173).

[18] İmam Əhməd (2/235, 301). Səhih hədisdir.

[19] Əl-Buxarinin öz «Səhih»ində rəvayət etdiyi hədis (№1039; 4697; 7379).

[20] Əl-Buxari (10/511, №6099, 7378); Müslim (4/2160, №2804).

*qulumsan, mən Sənin tanrınam» – deyən adamın fərəhindən də artıq olur»*[21].

Peyğəmbərin (s.a.v.) bu kəlamında isə Allahın güldüyü göstərilir: *«Allah biri o birini öldürmüş iki kişinin üzünə gülər və onların hər ikisi Cənnətə daxil olar...»*[22].

İbn Ömərin belə dediyi rəvayət olunur: «Həvazin döyüşündə əsir alınmış düşmənləri Allahın elçisinin (s.a.v.) yanına gətirdilər. Bu zaman bir qadın əsirlərin arasında o tərəf-bu tərəfə vurnuxa-vurnuxa bir oğlan uşağını tapıb bağrına basdı və əmizdirməyə başladı. Bunu görən Peyğəmbər (s.a.v.) dedi: *«Necə bilirsiniz, bu qadın öz uşağını oda atarmı?!* Biz dedik: *"Allaha and olsun ki, atmaz!"* Belə olduqda Peyğəmbər (s.a.v.) dedi: *«Allah Öz bəndələrinə bu qadının öz uşağına qarşı göstərdiyindən daha çox mərhəmət (şəfqət) göstərir»*[23]

### ALLAHIN MƏRHƏMƏTİNİN GENİŞLİYİNİ VƏ BU MƏRHƏMƏTİN YÜZ HİSSƏDƏN İBARƏT OLDUĞUNU BİLMƏK

Uca Allah Öz mərhəməti barədə buyurur: **«Mənim mərhəmətim hər şeyi əhatə etmişdir»** (əl-Əraf, 156).

Böyük Yaradan həmçinin buyurur: **«O, möminlərə rəhm edəndir»** (əl-Əhzab, 43).

Əbu Hüreyrədən (r.a.) rəvayət olunur ki, Allahın elçisi (s.a.v.) demişdir: *«Allah Öz yaratdıqlarını xəlq edəndə Ərşin üzərində Öz yanında olan bir kitabda belə yazdı: "Həqiqətən, Mənim mərhəmətim qəzəbimi üstələdi"»*[24].

Yenə də Əbu Hüreyrədən rəvayət olunur ki, Allahın elçisi (s.a.v.) demişdir: *«Allah mərhəməti yüz hissədən ibarət etmiş, onun doxsan doqquz hissəsini öz yanında saxlamış və bir hissəsini yerə göndərmişdir. Yaranmışların bir-birinə şəfqət göstərməsi göydən göndərilmiş bu bir hissə mərhəmətdəndir. Heyvanlara da bu mərhəmətdən pay düşdüyü üçün öz balalarına öz ayaq dırnağı ilə xətər yetirməkdən qorxaraq ayaqlarını ehtiyatla göyə qaldırırlar»; «Qiyamət gününü də Allah (mömin üçün) bu mərhəmətlə başa vuracaq»*[25].

### KAFİRİN YAXŞILIQLARININ ƏVƏZİNİN BU DÜNYADA ÇATDIRILMASINI (ONA BU DÜNYADA YAXŞILIQ EDİLMƏSİNİ) VƏ AXİRƏTDƏ ONA ƏZAB VERİLMƏSİNİ BİLMƏK

Uca Allah Öz bəndələrinə bu münasibətini belə ifadə etmişdir: **«Hər kəs fani dünyanı istəsə, dilədiyimiz şəxsə istədiyimiz neməti orada tezliklə verərik. Sonra isə** (axirətdə) **ona Cəhənnəmi məskən edərik»** (əl-İsra, 18).

Ənəs bin Malikdən (r.a.) belə dediyi rəvayət olunur: «Allahın elçisi (s.a.v.) dedi: *«Kafir bir yaxşı iş görsə, o işinə görə bu dünyada ona ruzi (işinin əvəzi)*

---

[21] Əl-Buxari (№6309) və Müslim (№2747).

[22] Əl-Buxari (№2826) və Müslim (№1890). Hədisin ardı: *«...Belə ki, kafir müsəlmanı öldürər, müsəlman şəhid olar. Sonra kafir müsəlman olub öldürülər və şəhid olar. Onların hər ikisi Cənnətə düşər».*

[23] Əl-Buxari (10/426, №5999); Müslim (4/2109, №2754).

[24] Əl-Buxari (6/287; №3194, 7422, 7453); Müslim (№2751).

[25] Əl-Buxari (10/431, №6000); Müslim (4/2108, №2752).

*verilər. Mömininin yaxşılıqlarını isə Allah axirət üçün toplayıb saxlayar və bu dünyada ona itaətinə görə ruzi verər»*[26].

**BÜTÜN NÖQSANLARDAN AZAD UCA ALLAHIN BAŞQALARINDAN (BƏNDƏLƏRİNDƏN) RAZI QALMAQ SİFƏTİNİN OLDUĞUNU TƏSDİQ ETMƏK**

Allah Öz hikmətli Kitabında buyurur: **«Mömінlər ağac altında sənə sədaqət andı içəndə Allah onlardan razı qaldı»** (əl-Fəth, 18).

Ənəsdən rəvayət olunan mərfu hədisdə deyilir: *«Həqiqətən, Allah, bir şey yeyəndə də, içəndə də Ona həmd edən bəndədən razı qalır»*[27].

**BÜTÜN NÖQSANLARDAN AZAD UCA ALLAHIN MƏHƏBBƏT (SEVMƏK) SİFƏTİNƏ MALİK OLDUĞUNU TƏSDİQ ETMƏK**

Əbu Hüreyrədən (r.a.) rəvayət olunur ki, Allahın elçisi (s.a.v.) demişdir: *«Əgər Uğur Sahibi Uca Allah bir bəndəni sevsə, Cəbraili səsləyib deyir: "Cəbrail, Allah filankəsi sevir, sən də sev!" Cəbrail də o bəndəni sevir. Sonra Cəbrail səmaya səs-soraq salıb beləcə deyir: "Həqiqətən, Allah filankəsi sevir, siz də onu sevin!" Beləliklə, həmin bəndəni səma əhli də sevir, yerdə də o bəndə hamı tərəfindən hörmətli bir şəxs kimi qəbul olunur»*[28]

Bəs Allah kimi sevir? Əlbəttə, tövbə edənləri, pak adamları, Allahdan qorxanları, səbirli (dözümlü) adamları, Allaha təvəkkül edənləri və mücahidləri (din uğrunda canından keçənləri). Bu göstərilən sifətlərin əksinə malik bəndələri isə Allah sevmir.

Uca Allah kimləri sevdiyi haqda buyurur: **«...Allah elə bir tayfa gətirər ki, Allah onları, onlar da Allahı sevərlər, onlar möminlərə qarşı mülayim, kafirlərə qarşı sərt olarlar»** (əl-Maidə, 54);

**«Həqiqətən, iman gətirib yaxşı işlər görənlər üçün Rəhman** (hamıya rəhm edən Allah) (ürəklərdə) **bir sevgi yaradacaqdır»** (Məryəm, 96)

**QÜDRƏTLİ VƏ BÖYÜK ALLAHIN ÖZÜNÜN BİR ÖVLİYASINA (ÖZÜNƏ YAXIN OLAN BİR ADAMA) DÜŞMƏNÇİLİK EDƏNLƏRDƏN İNTİQAM ALDIĞINI BİLMƏK**

Uca Allah Öz peyğəmbərlərinin sözlərini yalana çıxaran günahkarlardan intiqam aldığını göstərmişdir: **«... Biz günahkarlardan intiqam aldıq. Möminlərə kömək etmək Bizə vacibdir»** (ər-Rum, 47).

Əbu Hüreyrənin (r.a.) belə dediyi rəvayət olunur: «Allahın elçisi (s.a.v.) dedi: *«Həqiqətən, Allah belə dedi: "Kim mənim bir övliyama düşmənçilik etsə, Mən ona müharibə elan edərəm. Qulumun Mənə yaxınlıq etməsi üçün Mənim*

---

[26] Müslim (4/2162, №2808).

[27] Müslim (4/2095, №2734).

[28] Əl-Buxari (13/461, №7485). Bu hədisdə Uca Allahın məhəbbət sifəti ilə yanaşı danışmaq sifəti də öz əksini tapmışdır. «Qəbul olunar» ifadəsi ilə həmin bəndəyə qarşı insanların ürəklərində məhəbbət, meyl və ondan razılıq hisslərinin baş qaldırmasına işarə olunur. Əl-Buxarinin (1367) və Müslimin (949) rəvayət etdikləri başqa bir hədis də bu fikri təsdiq edir. O hədisdə belə bir ifadə işlədilir: «Siz yer üzündə Allahın şahidlərisiniz».

*ona fərz buyurduqlarımı yerinə yetirməkdən sevimli heç bir vasitə ola bilməz. Nə qədər ki, qulum Mənə nafilə (əlavə) ibadətlərlə yaxınlıq edir, Mən onu sevərəm. Elə ki onu sevdim, onun eşidən qulağı, görən gözü, tutan əli, gəzən ayağı olaram. O Məndən bir şey istəsə, verərəm, Mənə pənah gətirsə ona sığınacaq verərəm. Onun Mənə aid hər bir şeydə istədiyini tərəddüd etmədən verərəm. Yalnız ölmək vaxtı çatanda ölümü zəruri olan, lakin ölmək istəməyən, Mənim də pisliyini istəmədiyim mömin bəndəmin ruhunu bədənindən çıxaranda tərəddüd edərəm"»*[29].

**ALLAHIN ADINDAN DANIŞMAĞIN (ƏLEYHİNƏ AND İÇMƏYİN) QADAĞAN OLDUĞUNU BİLMƏK**

Cündəbdən (r.a.) rəvayət olunan mərfu hədisdə deyilir: *«Bir dəfə bir kişi dedi: "Allaha and olsun ki, Allah filankəsin (günahlarını) bağışlamayacaq!" Uca Allah onun sözünü eşidib soruşdu: "Mənim adımdan Mənim əleyhimə danışıb Mənim filankəsin günahlarını bağışlamayacağımı deyən kimdir? Bil ki, Mən artıq onu bağışladım və sənin əməlini puça çıxartdım"»*[30]. Burada «adından danışmaq» and içmək mənasını verir. Çünki bu, Allahın rəyini bilmədən Allaha əsaslanıb söz deməkdir. Allahın əleyhinə and içmək isə olmaz.

**UCA ALLAHIN TƏƏCCÜBLƏNMƏK SİFƏTİNƏ MALİK OLMASINI TƏSDİQ ETMƏK**

Yenə də Cündəbdən rəvayət olunan mərfu hədisdə belə deyilir: *«Bizim Tanrımız Cənnətə zəncirlərlə aparılan bir tayfanı görəndə təəccübləndi»*[31].

Onlar Cənnətə ona görə zəncirlə aparılırdılar ki, möminlər onları əsir edib zəncirləmişdilər. Elə ki, onlar İslamın doğru yol olduğunu gördülər, könüllü surətdə İslama daxil oldular, buna görə də Cənnətə düşdülər. Deməli, əsirlərin zəncirlənərək məcburi aparılmasına onların müsəlman olandan əvvəlki vəziyyətləri səbəb olmuşdur.

**UCA ALLAHIN NAZİL OLMASININ (ENMƏSİNİN) DOĞRULUĞUNU BİLMƏK**

Allah Öz Kitabında buyurmuşdur:

**«Sənin Tanrın gələndə mələklər sıra-sıra düzülər»** (əl-Fəcr, 22)

Burada Allahın Qiyamət günü Öz qulları arasında haqq-hesab kəsməyə gələcəyindən söhbət gedir. Bu enmənin necəliyinə gəldikdə isə, bütün nöqsanlardan azad Böyük Yaradanın Öz istədiyi kimi enməsinə (nazil olmasına) nə mane ola bilər?

Əbu Hüreyrədən (r.a.) rəvayət olunur ki, Allahın elçisi (s.a.v.) demişdir: *«Bizim Uğur sahibi Uca Tanrımız hər gecə gecənin sonuncu üçdə biri qalan vaxt aşağı səmaya enir və deyir: "Mənə dua edənin duasına cavab verməyə, Məndən bir şey istəyənin istədiyini verməyə, Məndən öz günahlarının bağışlanmasını*

---

[29] Əl-Buxari (11/340, №6502). Əl-Buxarinin «Səhih»inin şərhçisi İbn Həcər əl-Əsqəlani demişdir: «Burada «Allahın övliyası» dedikdə, Allahı tanıyan, itaətin bütün tələblərinə riayət edən və ibadəti yalnız Allaha aid (ixlasla) edən bəndə nəzərdə tutulur.

[30] Müslim (4/2023, №2621).

[31] Əl-Buxari (6/145, №3010); Əhməd (2/457).

*istəyənin günahlarını bağışlamağa gəlmişəm!"»*[32]

### MÖMİNLƏRİN QİYAMƏT GÜNÜ ÖZ TANRISINI GÖRƏCƏKLƏRİNİ TƏSDİQ ETMƏK

Uca Allah buyurmuşdur: **«O gün üzlər güləcək** (parlayacaq)**. Öz Tanrısına baxacaq»** (əl-Qiyamə, 22-23).

Cəririn[33] (r.a.) belə dediyi rəvayət olunur: «Bir dəfə biz Peyğəmbərin (s.a.v.) yanında idik. O, gecə vaxtı bədrlənmiş aya baxıb dedi: *«Siz öz Tanrınızı (indi) bu ayı gördüyünüz kimi görəcəksiniz. Onu görəcəyinizə heç şübhə etməyin. Bacardıqca günəş çıxandan və batandan əvvəl qılmalı olduğunuz namazlarınızı qılmamış olmayasınız. Bunu unutmayın!»*[34]

Əbu Musanın (r.a.) belə dediyi rəvayət olunur: «Allahın elçisi (s.a.v.) dedi: *«Qab-qacağı və hər şeyi qızıldan olan iki cənnət (bağ), qab-qacağı və hər şeyi gümüşdən olan iki cənnət var. Adamlarla onların Tanrısı arasına girib onların özlərinin Tanrısına baxmasına yalnız Ədn cənnətində (Cənnət bağında) Onun üzündə olan vüqar (böyüklük, əzəmət, təkəbbür) örtüyü (rəngi) mane ola bilər»*[35].

### ALLAHIN ÖZ YAXINLIĞI İLƏ ÜLVİ, ÖZ ÜLVİLİYİ İLƏ YAXIN OLDUĞUNU BİLMƏK

Uca Allah isə buyurmuşdur: **«Bəndələrim Məni səndən soruşduqda söylə ki, Mən onlara yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edərəm...»** (əl-Bəqərə, 186).

Yenə də Əbu Musanın belə dediyi rəvayət olunmuşdur: «Allahın elçisi (s.a.v.) *dedi: «Ey insanlar, sakit olun! Siz nə bir kara, nə də burada olmayan birisinə dua edirsiniz. Əksinə, siz hər şeyi Eşidən və Görən birisinə dua edirsiniz. Sizin dua etdiyiniz sizin hər birinizə onun dəvəsinin boğazından da yaxındır»*[36] O bunu səhabələr uca səslə zikr edəndə demişdir.

Qüdrətli və Böyük Allaha iman gətirib bütün bu göstərilən məsələlərdən xəbərdar olan şəxs, şübhəsiz ki, özünün Xaliqini – bütün aləmlərin və onlardakı

---

[32] Əl-Buxari (3/29, №№6321, 7494); Müslim (1/521, №758). Allahın aşağı səmaya enməsi (nazil olması) sübut olunmuş məsələdir. Bu enmə Onun Öz böyüklüyünə, əzəmətinə və hökmünə layiq bir enmə olduğundan ondan bəhs edəndə təhrifə və yanlışlığa yol verməк, onun necə baş verdiyini soruşmaq, yaxud onu Allahın xəlq etdiklərinin enmə hərəkətinə bənzətmək olmaz.

[33] Cərir bin Abdullah əl-Bəcli. Məkkənin fəthindən əvvəl İslama daxil olmuşdur. Gözəl simalı, nəcib bir adam olmuşdur. Peyğəmbər onun haqqında demişdir: «Tayfanın nəcibi sizin yanınıza gələndə ona ehtiram göstərin!»; «Cərir də Peyğəmbər ailəsinin üzvlərindən biridir». Peyğəmbər onu Zü-l-Xəlsə qəbiləsinin bütünü dağıtmağa göndərmişdir. Deyilənə görə, Peyğəmbər onun üzünün gülmədiyini görməmişdir. O, tayfası ilə birlikdə Qadisiyyənin fəthində böyük rol oynamışdır. Qırğızıstanda yaşamış, hicri 54-cü ildə vəfat etmişdir.

[34] Əl-Buxari. Hədis Hafiz İbn Həcər əl-Əsqəlaninin əl-Buxarinin hədis toplusuna yazdığı «Fəth əl-Bari» adlı şərhdən götürülmüşdür (2/42; №4851, 7434, 7435, 7436).

[35] Əl-Buxari (8/623, №4878, 4880, 7444); Müslim (180).

[36] Əl-Buxari (6610); Müslim (2704); İmam Əhməd (4/407).

varlıqların yaradıcısı Uca Allahı tanıyar.

